# Molla Nəsrəddin



# ملا نصرالدين

E-kitab halına saldı: Cavid Ağa

*Şənbə, 14 şaban 1339* **On altımcı il** *3 sövr 1300*

# ملا نصر الدين

# MOLLA NƏSRƏDDİN

*Şümarə 6* *Qiyməti satıcı əlində on altı şahı* *№6*




***Yığılın, yığılın dua oxunacaq hamıvız İncil otağına, dalı qalan buraxılmayacaq.***







*Abunə qiyməti:* *Hər həftə nəşr olunur* *Məhəlli-idarə:*

| | |
|---|---|
| İlliyi | 40 qran |
| Yarım illiyi | 22 qran |
| Üç aylığı | 12 qran |
| Tək nüsxəsi satıcı əlində | 16 şahı |
| Əcnəbi məmləkətlərdə | |
| İlliyi | 60 qran |

Təbriz, bazari usta şagird,
xanəyi şahzadə Nüsrətüssəltənə

Teleqraf və post ünvanı:
Təbriz, "Molla Nəsrəddin"

## MÜŞTƏRİLƏRƏ

1) İdarəmizə müraciət edən təbrizli ağayani-möhtərəmlərdən iltimas edirik ki, məcmuəmizdə dərc olunası məqalələri bəqədri-imkan şəhər postu vasitəsilə idarəmizə göndərsinlər, çün məqalələr barəsində zəbani sual-cavaba vaxtımız azdır.

2) Təbrizdən və qeyri şəhərlərdən göndərilən məktublar və məqalələr ya farsi dilində ya türk dilində, müxtəsər yazılmalıdır və illa idarəmizin şənində müfəssəl və zınqırovlu ibarələri, tə'rif və töfsifləri yazmağa yazanların vaxtı və oxumağa bizim vaxtımız nahaq yerə zay olur.

3) İdarəmizə göndərilən məktublar açıq Qur'ani xətlə, müəyyən imza ilə yazılsınlar. Tapmacalı tərəssül xəttinə təqlidən şikəstə, yəni qol-qanadı sınıq yazılar bizi çox zəhmətlərə salırlar.

4) Məktubun üç səhifəsini təmiz qoyub, qabaqkı yazıq səhifəyə yetmiş iki mətləb doldurmasınlar, yetmiş iki haşiyə çıxmasınlar, hərfin öz nöqtəsini öz yerində qoysunlar və elə rizə yazmasınlar ki, biz zərrəbinə möhtac olaq.

Əgər bu şərt mülahizə olunmazsa, mümkündür ki, idarəmizə göndərilən məktublara e'tina olunmaya.

*İdarədən*

## ƏDƏBİYYAT

Yazdılar bir namuradın daşına bu misraı. — Nəfsinə məğlub olan kax içrə xar olsun gərək.

Bir cavanın kisəsində yüz tümən gördüm dünən — İndi bir dinarı yox, bais qumar olsun gərək.

Sahibi-vicdan olan həmnövini xar istənıəz, — Bir pərişanhali görcək biqərar olsun gərək.

İldə yüz min xəstəni cahil təbib eylər həlak — Xaki-pakın, ey vətən, yeksər məzar olsun gərək.

Nasehı-bimədrəkin başı nə qədri təndədur — Künci-qurbətdə cavanlar ıxtıyar olsın gərək.

Bərfi ənbar eyləmək göylərdə fıkri var ikən — Yerdə xəlqin həqqi var ənbardar olsun gərək.

Həqq özü alimdi sənətkar yox iranlıda — İstəkanü nəlbəki göydən nisar olsun gərək.

Buğları mətruş bir oğlana baxdım qeyzılə — Söylədi: bığ saqqal ilə həməyar olsun gərək.

Məsləhət bilsəydi Xaliq xəlq edərdi maşını — Xəlq edib eşşəkləri, millət süvar olsun gərək.

Daima bir milləti-nadanı irşad etməyə — Bir peyəmbər, bir Əli, bir Zülfiqar olsun gərək.

Ya gərək təzvir edəm, ya başü canımdan keçəm — Ömrü başa vurmağa şamü nahar olsun gərək.

Rəxnədar olsun camaat, payimal olsun vətən, — Hər nolur olsun, müridim bişümar olsun gərək.

Payimal oldu camaat, ey qulağı tüklülər, — Tazə məktəblər binası tarimar olsun gərək.

Ey camaat, cəm olun cığ-mığ sədasın qət edin, — "Lam" "zəbər"lə "hey" dü "zir" "heyn" aşikar olsım gərək

Tazə çıxmış bu kitaba, ey müsəlman, bir baxın, — Bu ilan, bu qurbağa, bu susmar olsun gərək.

Bu yoğun quyruqlu heyvanı görürsüz, ya xeyir, — Altına yazmışlə: tülkü hiyləkar olsun gərək.

Bu şəkillər şirkdür başdan ayağa Xaliqə, — Tülkini xəlq eyləyən pərvərdigar olsun gərək.

Boş yerə Allah bəla göndərmiri biz millətə — Min bəlavü möhnətə müşrük düçar olsun gərək.

*İmza: Tazə şair*

# MİSYONERLİK

İranda hələ köhnə istibdaddan çox yadigarlar var, biri də misyonerlikdir.

Rusiyada misyonerlik istibdadın atası birinci Pavel padşah tərəfindən təsis olunmuşdu. Hərçənd ikinci Aleksandrın azadixahlığı sayəsində misyonerlər hörmətdən düşdülər, amma axırımcı Nikalay əsrində misyonerlər genə nüfuz qazanmışdılar, belə ki, Qazan müsəlmanları içində məşhur Radlov, Türküstanda Ostraumov və Qafqaziyada Miropyevlər xeyli bir zaman müsəlmanların qanını şişəyə tutmaqda idilər ki, axır inqilabda onlar hamısı əziz ömürlərini İrandakı misyonerlərə bağışlayıb rədd oldular.

Bir saatlığa biz özümüzü azadixahlığa qoyaq və bu babətdən razı oluruq ki, müsəlmanın da gərək haqqı olsun Amerikada yainki Yaponiyada öz dinini təbliğ etməyə, xristianlar da bizim azad məmləkətdə öz ayinlərini azad surətdə tərvic eləsinlər. Amma mətləb buradadır ki, xristian misyonerliyi İranda kapitulyasion məcburiyyəti ilə təşkil tapıb və məhz bu səbəbdəndir ki, İran hökuməti misyonerlikdən dəfəat ilə baş verən zəhmətlərə qatlaşıb və bunun qabağını almağa pul tapmayıbdır. Məsələn, götürək İsmayıl ağa faciəsini: İranın qərb sərhədlərinin keçmişdə siyasi həvadisatından baxəbər olanlar bizim işarələrimizdən çox qəziyyələr yada sala bilərlər.

Biz zəif bir millətik. Amerika kimi əzəmətli bir məmləkətdən biz çox maddi və mənəvi köməkliklərə müntəzir ola bilərik və hər birinin müqabilində öz ixlasımızı izhar edə bilərik. Amerika axır vaxtlarda möhtaclarımıza müavinət əli çatdİranda biz haman nəcib və şücaətli millətin yer üzündə varlığına iftixar edirdik.

Amma ..., minlərcə təəssüf olsun ki, qism-qism elm, fənn, sənət mə'dəni hesab olunan Amerika məmləkətindən professorlar və ustadlar əvəzinə bizə göndərilən töhfələr ibarət olur uzun ətək və uzun saqqal misyonerlərdən, fənni mədrəsələr və sənətxanalar yerində keşişxanalar bina olunur...

Biz mehmandostluq babətindən və azadixahlıq xatirəsi üçün məmləkətimizdə yaşayan cəmi xristian millətlərinə və o cümlədən misyonerlərə də riayət etməyə hazırıq. Amma haman azadixahlıq naminə onlar da gərək zəmanənin təqazasını mülahizə eləyib, öz ruhani istibdadından əl çəkələr və dini təbliğatlarında məcburiyyətliyi bilmərrə tərk qılalar. Onlar öz pulları ilə təsis etdikləri mədrəsələrə qeyri xristian uşaqlarını qəbul etməyə məcbur ki deyillər. Amma zəmani ki, möhtaclara rəhm eləyib, onları dərsdən bibəhrə qoymaq istəmədilər, o vaxt dəxi bir belə ağır təklifi yeddi-səkkiz yaşında uşağın boynuna qoymayalar ki, onlar gərək xaçpərəst dərslərini və ibadətlərini məcburən qəbul eləsinlər.

Necə ola bilər balaca müsəlman uşaqlarını cəbrən ata-anasının dinindən yadırğadıb İncil və İsa dərsləri ilə beyinlərini laxlatmaq, onları cəbrən xristian ibadətxanasına daxil eləmək? Əcəba, ziyalı bir Amerika milləti bunu rəva görür? Hətta keçən istibdad dövrlərində də misyonerlikdə məcburiyyət bu əndazədə deyildi ki, indi İrandadır.

İdareyi-mə'arifımiz görəsən bu məqaləmizdən incimədi ki?

*Molla Nəsrəddin*

## İANƏ

Təbrizdə nəşr olunan "Minarə" adında erməni ruznaməsinə Qəzvin ermənilərі tərəfindən iki yüz əlli tümən ianə göndərilibdir.

Təəccub eləmək lazım gəlmir kı, iranlılar bu növ himmətdən uzaqdırlar, zira ki, İranda indiyə qədər nəşr olunan İran ruznamələrinin əksəri ya böyük mənbədən ya böyük əşxasdan pullar alıb o mənbənin və o əşxasın mürəvvəci-əfkarı olublar, yə'ni onların əfkarına xidmət ediblər.

Çox az ittifaq düşüb ki, ruznamələr ümumun rəğbətinə təkyə eləyib, məhz millətə və genə də millətə qulluq edələr.

Millət də bu mətləbi yaxşı düşünüb və yaxşı bilər ki, İran ruznamənəvisləri öz başlarını saxlamaqda aciz deyillər.

*İmza: Qızdırmalı*

## İXTAR

Çün irani qurulan saatlar ilə alafranqa saatları mabeynində ixtilaf əmələ gəlir, bu səbəbdən idarəmizə təşrif gətirən ağalara bir müəyyən vaxt təyin eləmək mümkün olmur. Belə olan surətdə ixtar olunur ki, idarəmizə işi düşən ağalar təşrif gətirə bilər qonşuluğumuzdakı Dadaş hamamının səhər burğusundan axşam burğusuna kimi və illa, səhər burğu çalınmamış və axşam burğusundan sora bir kəsi qəbul etməyə vaxtımız yoxdu.

Və bunu da lazım görürük tövsiyə edək ki, qeyri məhəllələrdə də saat əvəzinə hamam burğularını mülahizə etmək dəxi də məsləhətdir.

## TƏQVİM

Ay Molla əmi, ayıb olmasın nökərinizin (yə'ni bizim oğlanın) bir toyuğu var idi ki, neçə müddətdir saxlardı, mən ha deyərdim, ay oğlum, bir toyuğu neylirsən? Mənə cavab verərdi ki: yumurtlayacaq! Ha soruşardım ki, oğlum bəs bu nə vaxt

yumurtlayacaq? Elə deyirdi: yumurtlayacaq. Həmişə çörəyinin yarısını verərdi toyuğa. Ancaq bir iki il keçdi bu heç yumurtlamadı. Mən lap şəkkə gəlib istərdim toyuğu oğlandan gizlin öldürüb salam səbətə, genə oğlanın xatirinə qıymazdım.



Bir neçə gün bundan qabaq, gördüm oğlan bir gün yügürə gəlir və əlində bir yumurta və ucadan çağırır ki, muştuluğumu ver, toyuq yumurtlayıb. Mən təəccüb elədim ki, bu toyuq iki ildir yumurtlamazdı, indi necə oldu ki, yumurtladı. Oğlan dedi: mən cəhətini bilirəm. Bu gün mən yol ilə gələndə bir nəfər gəlib bir kişidən soruşdu ki, bu il nə üstə təhvil olub, o da dedi ki, toyuğ üstə. Onda mən bildim ki, toyuğum yumurtlayacaq, nəinki gündə bir dənə, bəlkə keçən illərinkini də bu il yumurtlayacaq və bir də haman kişi bunu da dedi ki, hər il bir heyvan üstə təhvil olar və elmi – nücumdan baxəbər olanlar və təqvim yazanlar o heyvandan çox şeylər istixrac edirlər. Bu il də toyuğ üstə təhvil olub və adına tixaqoy ili deyirlər və bu ildə xorus və toyuğ və yumurta çox bol olar. Amma nə deyim, gələn ildən ki, Allah özü hifz eləsin ki, it üstə və sonra donquz üstə təhvil olacaq. Dedim, sən Allah, əgər sizdə təzə təqviın var isə mənə də göstərin ki, mən də bu ilin əhvalatından xəbərdar olum. Dedi: bəli, bəli, keçən illərdə bir münəccimüddövləmiz var idi. İmdi əlhəmdülillah üç münəccimüddövləmiz və üç cür təqvimimiz vardır və lap səhihi ağayi Əllami Fəhami Hacı molla Mehdi Xorasaninin mübarək təqvimidir ki, tamam vəqaiyi günü ilən və saatı ilən müəyyən buyurub ki, belə baş səfhədə yazır:

Ovzaye setareqan dəlalət darəd bər gəraniye bəzi əcnas və ərzaniye bərxi digər və nozule bərf dər 26 in mah.

Mən bilmədim hansı şey bahalanaçaq və hansı şey ucuzlanacaq. Dedim, açılan ayı da buyurun görək. Şaban ayında belə yazmışdı:

Ovzaye kəvakıb dəlalət darəd bər boruze gerani ke əz bisto nohome şəban şoru mişəvəd və vuque qətl və hərbdər şomal ke əz bist o həftom ağaz mişəvəd və zelzəle dər bist o dovvom və mout dər Italiya dəvazdəhome rəməzan və inqilabe övzae müxtəlifeye mərdom dər Semnan və Dəmğan və Bistam.



Bu axırıncı sözü başa düşə bilmədik. O cəhətdən sizə zəhmət verib sizdən soruşurux ki, bizə buyurasınız ki, bu övzayi-mərdüm nədir ki, ulduzlar onu Semnan və Bistamda nişan verirlər, ta sora o biri aylara baxaq. Və təvəqqe edirəm ki, buna cavab yazasınız və icazə verəsiniz ki, o biri aylarda da əgər işkalımız olsa yazıb soruşaq. Təqvimin mabədi olacaq.

*İmza: Yıldız*

## XANIMLAR MƏİŞƏTİNDƏN

Talei xoşmuş qızın, bəxti cavan, Gülsənəm,
Göndərib elçi məni Hacı Zaman, Gülsənəm.



Telpərinin ərz edim səkkizə çatmış yaşı,
Bircə nəfər istəyən yoxdu yazıq külbaşı,
Qızcığazın qüssədən qanə dönüb göz yaşı.
Hacı Zaman dün bizə gəldi bişirdim aşı,
Azca qalıb iş tuta, belə güman, Gülsənəm,
Talei xoşmuş qızın, bəxtı cavan, Gülsənəm.



Hacı deyirdi, dünən, qız ona gəlsə əgər
Dəvət edib mollanı, övrəti tez rədd edər,
Bir də deyirdi bunu, istəsələr simü zər,
Gözlərim üstə mənim, iş düzələ müxtəsər.
Eşqi qızın qoymayıb onda təvan, Gülsənəm.
Talei xoşmuş qızın, bəxtı cavan, Gülsənəm.



Şükr xudaya, hələ üç yaşar idi Sara
Bildir onu istədi almağa Hacı Qara,

Vaxtı deyildi o dəm, qoymadım iş qurtara,
İndi bu yaz qız gərək altı yaşın qurtara,

Çatsa əgər yeddiyə olmaz alan, Gülsənəm
Talei xoşmuş qızın, bəxtı cavan, Gülsənəm.

*İmza: Dabanı çattax xala*

## TAZƏ PARTİLƏR

Axır vaxtlarda Xoyda Amerika üsulu ilə dörd müstəqil parti təşkil tapıb.

Birinci parti Qulu xan partisidir. Parlaman üzvləri İqbaüssəltənə atlılarından intixab olub. Rəisül-vüzəra məzkur Qulu xandır ki, prizident deməkdir.

İkimci parti İlxani partisidir; parlaman ə'zaları sərbazlardan ibarətdir. Prizident həmin ilxanidir.

Üçümcü parti jandarm partisidir. Rəisi-major... xan, ə'zayi-parlaman jandarmalardan ibarətdir.

Dördümcü Kəlbalı xan partisidir. Parlaman ə'zası Maku atlılarından məxfi rə'ylə intixab olunub.

Bu ad verdiyimiz dörd partiləri altı il bundan əqdəm hətta Paris konfransı da təsdiq etmişdi və hərçənd zahiri müahidələri mocibincə bunlar Şimali Amerika Müttəfiq hökumətləri üsulu ilə təşkil tapıblar; amma batində hər biri öz əməliyyatında müstəqildir. İndiki İsmayıl ağa qovğasında bunlar hərəsi bir ayrı əsas ittıxaz edıb, ayrı bır cəngavərlik fənnini istemal edir. Məsələn, Quluxan müharibədə millilik tərəfdarıdır, onunçun onun atlıları Xoy əhalisinin evlərinə doluşub can bir şişədə yaşayırlar və bir-birindən ayrı düşəndə nə bunun yeyib-içmək canına sınır, nə də onun.

O ki, İlxanidir, onun cəngazmudəliyi əzhər minəşşəmsdir. Məsələn, bunun sərbazları dava meydanında məşhur professor Müller sistemi ilə qışın şiddətli soyuğunda ayaqyalın və üryan, ancaq çiyinlərində ala çarşav olarmış ki, kürdlər uzaxdan görüb qorxsunlar və qaçsınlar.

Jandarma partisi Sparta sayağı ilə müharibəyə çıxırlar, yə'ni keçmiş tarixdə də müşahidə olunub ki, İtaliyada Qaribaldi səltənətlə vuruşanda sərbazları üç gün ac qaldılar və aclıqları səbəbindən elə bir qeyzə gəldilər ki, səltənət qoşunlarını iki günün ərzində Venesiya dəryasına tökdülər.

Hələ bundan əlavə həmin bu dörd partilərin bu axır vaxtda İsmayıl ağa qabağında müvəffəqiyyət tapmaqlarının ümdə səbəbi bu oldu ki, dörd qonşular, necə ki, ərz olundu, hər işdə azad və xudsərdir. Belə tutaq ki, prizidentin biri hökm eliyir ki, flan gün flan saət çıxaq flan yerə və flan səngəri işğal edək. Digər bir parti rəisi buna cavab verir ki, a kişi, sən olasan Allah, əl çək məndən. Kefim istər gedərəm, istəməz getmərəm.

Bunu da lazımdır qeyd etmək ki, bu dörd partilərin qoşunlarının azuqəsi Qarazıyəddin kəndində mərkəzi buğda ambarından çatır. Hər kəs desə ki, bu barədə camaata bir əziyyət yetişər, böhtandır, genə də böhtandır.

Mən təəccüb edirəm ki, bəs necə İsmayıl ağa bu qədər qüvvənin qabağında dayanır?

Kişi qurd ürəyi yeyib.

*Hərdəmxəyal*

## TAZƏ DƏGİRMAN

Eşitdiyimizə görə, bu tezlikdə çörəyin qiyməti xeyli ucuzlanacaq və bu ucuzluğa səbəb jandarmeriyanın maşın dəgirmanı olacaq ki, on yeddi il təmir olunmaqdadır. Bu dəgirman bir neçə gündən sora işə düşəcək və hər gün yeddi min xərvar buğda ügüdəcək. Hələ də dəgirmandan savayı elektrik matoru da otuz doqquz ildir tə'mir olunmaqdadır ki, bu günlərdə işə düşəcək və Təbrizin cəmi məhəllələrinə və hətta kasıbların da evlərinə işıq verəcək. Özü çox müftə, su qiymətinə. Hərçənd kasıb-kusub jandarmaların hüququndan kəsib həmin dəgirmana və matora çox pullar sərf elədilər, amma çörək ucuzlananda və kasıbların qaranlıq evləri ucuzca işıqlananda bunun əvəzi çıxar inşaallah, genə də inşaallah və maşaallah, genə də maşaallah.

*İmza: Qızdırmalı*

## ÜÇ ÇƏRƏK

Biz aşağıda qol çəkən mülk sahibləri eşitmişdik bələdiyyə qərardadına binaən, yıxılan divarları tə'mir edən vaxt lazımdır üç çərək dalı çəkilmək.

Biz bunu belə başa düşdük ki, divarı küçəyə tərəf lazımdır üç çərək dalı çəkmək. Amma indi başlayıblar müqəssir tutmağa ki, biz küçələri genəltmək əvəzinə daha da daraltdıq.

Bu barədə biz özümüzdə bir günah bilmirik, çünki biri budur ki, biz həqiqət tazə divarı üç çərək dalı çəkmişik, amma küçəyə tərəf dalı çəkmişik. Nə eybi var, o da dalıdı, bu da dalıdır. O baxır ki, üzünü hansı tərəfə tutasan. O ki qaldı küçə daralır, bunun da o qədər eybi yoxdur, çünki adam istəsə keçməyə özünü bir az yan tutar, dar küçədən də keçər.

*İmza: Sırtıx*

## HAMAMLARIMIZ

Hamamlarımızdan hər kəs hər nə yazır yazsın, amma Təbriz hamamlarının bir mühəssinatı budur ki, qərib bir adam şəhərimizə gələndə dəxi hamama getməkdən ötrü bir bələdçi lazım olmur. Hamamın qoxusu bir ağacdan çağırır.

## POSTA QUTUSU

**"Qazanbaş"a:** "Dəli"yə yazdığıvuz cavab xoşumuza gəldi, tezlikdə lazım olar, amma şe'rlərə və'də vermirik.

**"Aciz bəndə"**yə: Dükan sahibləri kirayəni artırmaqlarından o uzunluqda məqalə yazmaqdansa qıssaca qarğış elə ki, onlar aldıqları dükan kirayəsi burunlarının dəliyindən gəlsin.

**"Təzə şair"ə:** Qoy şe'rlərin hələ qurusun.
**"Yoldaş"a:** Müntəzir olma.
**"Fəqir"ə:** Genə həman söz.

*Müdir və sərmühərrir: Cəlil Məmmədquluzadə*

*Vəkillərimiz:*
*Təbrizdə – Dəme məqbərə, tovziye cərayed.*
*Bazare şüşegərxane, kitabxaneye "Pərvəriş".*
*Dəme hərəmxane, mətbəeye "Hüseyni".*

Təbriz, mətbəeye "Ümid"




*Tərbiyəsiz faytonçu: -Xanım, meylin çəkir bir qədər səni dolandırım, artıq pul almaram*

**Seyid Əli Müsəvvirzadə, Bəhzadi**

*Xanım: -Insan məhrəmilə faytonda olmaq qadağan, amma faytonçunun tərbiyəsizliyi heç! Nə münasibətsiz işdir*